


**AZƏRBAYCAN MİLLİ ELMLƏR AKADEMİYASI
NAXÇIVAN BÖLMƏSİ**

**НАХЧЫВАНСКОЕ ОТДЕЛЕНИЕ НАЦИОНАЛЬНОЙ
АКАДЕМИИ НАУК АЗЕРБАЙДЖАНА**

**NAKHCHIVAN SECTION OF THE NATIONAL
ACADEMY OF SCIENCES OF AZERBAIJAN**

# XƏBƏRLƏR

***TƏBİƏT VƏ TEXNİKİ ELMLƏR SERİYASI***

# ИЗВЕСТИЯ

***СЕРИЯ ЕСТЕСТВЕННЫХ И ТЕХНИЧЕСКИХ НАУК***

# NEWS

***THE SERIES OF NATURAL AND TECHNICAL SCIENCES***

**№3**

**Naxçıvan, «Tusi», 2006**

AZƏRBAYCAN MİLLİ ELMLƏR AKADEMİYASI NAXÇIVAN BÖLMƏSİNİN XƏBƏRLƏRİ
*Təbiət elmləri seriyası, 2006, №3*

ИЗВЕСТИЯ НАХЧЫВАНСКОГО ОТДЕЛЕНИЯ НАЦИОНАЛЬНОЙ АКАДЕМИИ НАУК АЗЕРБАЙДЖАНА
*Серия естественных наук, 2006, №3*

NEWS OF NAKHCHIVAN SECTION OF AZERBAIJAN NATIONAL ACADEMY OF SCIENCES
*The series of natural sciences, 2006, №3*

**MİRVASİF SEYİDOV**
Naxçıvan Elmi Tədqiqat
Baytarlıq Stansiyası

# NAXÇIVAN MUXTAR RESPUBLİKASINDA QUŞLARIN İKSODOFAUNASINA DAİR ARAŞDIRMALAR VƏ ONUN NƏTİCƏLƏRİ

Məlumdur ki, Naxçıvan MR-in iqtisadiyyatının əsas sahələrindən biri quşçuluqdur. Muxtar Respublikada quşçuluğun artım dinamikasını, eləcə də məhsuldarlığının yüksəldilməsini ləngidən amillərdən biri də qan-parazitar xəstəlikləri və onların keçiriciləri hesab edilən iksodid (*İxodidae*) gənələridir. Bu gənələr Naxçıvan MR-də geniş yayılmasının əsas səbəbi onların inkişafı üçün burada əlverişli şəraitin mövcud olmasıdır.

*İxodidae* gənələrinin inkişafı və yayılmasında kənd təsərrüfatı heyvanları ilə yanaşı vəhşi heyvanların, quşların da böyük rolu vardır. Bu tip gənələrin inkişaf dövrü, təbiətdə mövsumi parazitlik müddətlərini, həmçinin qidalanma mənbələrini bilərək onlara qarşı mübarizə aparmaq mümkündür.

Yuxarıda göstərilənləri nəzərə alaraq Muxtar Respublikada iksodofaunanın öyrənilməsini qarşımıza məqsəd qoyduq. Apardığımız tədqiqatlar ev və çöl quşlarının iksodofaunasının öyrənilməsinə yönəldilmişdir. Bu məqsədlə 1987-1990-cı illərdə planlı surətdə tədqiqatlar aparılmış və ondan sonrakı illər ərzində isə bu istiqamətdə müşahidələr qeyri ardıcıl olsa da davam etdirilmişdir (1).

Aparılmış tədqiqatlar dövründə 11 növdən olan 477 baş vəhşi və ev quşu müayinə edilərək onların üzərində parazitlik edən iksodid gənələri toplanıb növ tərkibləri təyin edilmişdir (2).

Müayinələr zamanı 50 baş, başqa sözlə 10,5 % quşun bu gənələrlə yoluxması aşkar edilmişdir (Cədvəl). Yoluxmuş quşlardan 241 ədəd müxtəlif inkişaf mərhələsində olan iksodid gənəsi toplanıldı. Gənələrin növ tərkibi müəyyən edilərkən məlum oldu ki, ev və vəhşi quşlarda 5 növ iksodid ailəsinə mənsub olan gənə növü: Hl. asiaticum Hl. marqinatum, R. sulcata, R. turanicus və H. punctata parazitlik edirlər. Bu növ gənələrlə yoluxma ən çox kəkliklərdə (53,0 %), alaqarğalarda (44,4 %), və çöl qarğalarında (41,7 %), orta yoluxma sığırcınlarda (37,5 %), sağsağanlarda (30,8 %), vəhşi göyərçinlərdə (20,8 %), daha az yoluxma isə ev toyuqlarında (1,4 %), hind quşlarında (5,6 %), ev göyərçinlərində (7,7 %) qeyd olunur (2,4).

**Cədvəl**

## Naxçıvan MR-də quşların iksodofaunasına dair

| S № | Quşların növü | Quşların növü | | Yoluxma faizi | Gənə toplanıb | | GƏNƏLƏRİN NÖVÜ | | | | | | | | | | | | | | |
|---|---|---|---|---|---|---|---|---|---|---|---|---|---|---|---|---|---|---|---|---|---|
| | | | | | | | Hl.Asiaticum | | | Hl.marginatum | | | R.sulcata | | | H.punctata | | | R.iuranicus | | |
| | | Cəmi yoxlanıb | Onlardan yoluxub | | Cəmi | Hər başa orta hes. | İ | N | S | İ | N | S | İ | N | S | İ | N | S | İ | N | S |
| 1 | Toyuq | 215 | 3 | 1,4 | 17 | 5,7 | - | 4 | - | - | - | - | - | - | - | - | 11 | 2 | - | - | - |
| 2 | Hind quşu | 72 | 4 | 5,6 | 15 | 3,7 | - | - | - | - | 8 | 4 | - | - | - | - | - | - | - | 3 | - |
| 3 | Ev göyərçini | 13 | 1 | 7,7 | 4 | 4,0 | - | - | - | - | - | - | - | - | - | - | 3 | 1 | - | - | - |
| 4 | Vəhşi göyərçin | 24 | 5 | 20,8 | 40 | 8,0 | - | 3 | 1 | - | - | - | 11 | 8 | - | - | 10 | 5 | - | 2 | - |
| 5 | Çöl qarğası | 12 | 5 | 41,7 | 25 | 5,0 | - | - | | - | 10 | 8 | - | 7 | - | - | - | - | - | - | - |
| 6 | Alaqarğa | 18 | 8 | 44,4 | 30 | 3,7 | - | - | | - | 8 | 4 | - | - | - | 1 | 3 | 7 | - | 5 | 2 |
| 7 | Vəhşi ördək | 5 | - | - | - | - | - | - | - | - | - | - | - | - | - | - | - | - | - | - | - |
| 8 | Kəklik | 17 | 9 | 53,0 | 63 | 7,0 | - | 17 | 4 | - | - | - | 7 | 4 | 12 | 14 | 5 | - | - | - | - |
| 9 | Sığırçın | 8 | 3 | 37,5 | 10 | 3,3 | - | 8 | 2 | - | - | - | - | - | - | - | - | - | - | - | - |
| 10 | Sağsağan | 13 | 4 | 30,8 | 37 | 9,3 | - | 6 | 2 | - | 10 | 1 | 2 | 13 | 3 | - | - | - | - | - | - |
| 11 | Ev qazı | 80 | - | - | - | - | - | - | - | - | - | - | - | - | - | - | - | - | - | - | - |
| | Cəmi: | 477 | 50 | 10,5 | 241 | 4,8 | - | 38 | 9 | - | 36 | 17 | 20 | 32 | 15 | 15 | 32 | 15 | - | 10 | 2 |

Ev qazları və vəhşi ördəklərdə iksodid gənələri ilə yoluxma müəyyən edilmədi. Həmin quşların həyat şəraitinin su ilə bağlı olması onu göstərir ki, bu şərait iksodid gənələrinin inkişafı üçün əlverişli deyildir. Buradan belə nəticə əldə etmək olar ki, iksodid gənələrinin inkişafında ekoloji şərait əsas amil hesab edilməlidir (3).

Quşlar arasında iksodid gənələrinə yoluxma intensivliyinə görə sığırçınlar, vəhşi göyərçinlər, kəkliklər ön sırada durur. Onlardan nisbətən az yoluxma intensivliyi çöl qarğalarında, ev göyərçinlərində və toyuqlarda aşkar olunur.

Qeyd etmək lazımdır ki, toplanmış materialın əksər hissəsini 85,5 %-ni yetkin mərhələyə çatmamış 14,5 % -i isə imaqo mərhələsində olan iksodid gənələri təşkil edir.

Hl. asiaticum və H.punctata növü 5 növ, Hl. marqinatum və R. sulcata 4 növ, R.turanicus isə 3 növü quşlarda parazitlik edirlər. Hl. asiaticum, Hl. marqinatum və R. turanicus növlərinin imaqo mərhələsində quşlarda parazitlik etməsi müəyyən edilmədi. Bu növlər ancaq surfə və nimfa mərhələrində quşlarda parazitlik edirlər.

R.sulcata və H. punctata növlərinə isə hər üç məhələdə (imaqo, nimfa və surfə) quşlarda parazitlik etməsi müəyyən olunmuşdur.

Hl. asiaicum, Hl. marqinatum, R. sulcata, daha çox vəhşi quşlarda, H. punctata ev quşlarında, R. turanicus isə həm vəhşi, həm də ev quşlarında parazitlik edirlər.

## NƏTİCƏ

1. Ev quşları və vəhşi quşlar iksodid ailəsinə mənsub olan gənələrin sürfə və nimfa mərhələsində (85,5 %), nisbətən az halda isə imaqo mərhələsində (14,5 %) qidalandırıcıları hesab olunur.
2. Su quşları iksodid ailəsindən olan gənə növlərinin qidalandırıcısı olmamaqla, bu quşların ekoloji şəraiti gənələrin inkişafı üçün əlverişli deyildir.

## ƏDƏBİYYAT


1. Seyidov M. Naxçıvan MR-da iksodofauna və kənd təsərrüfatı heyvanlarının yoluxma vəziyyəti / Azərbaycan Aqrar elmi, Bakı, 2004, №1-3, s. 157-158.
2. Померанцев Б.И.Фауна СССР, Паукообразные иксодовые клещи *İxodidae* М., 1950, Изд-во АН СССР, с. 101-218.
3. Узаков У.Я. Иксодовые клещи Узбекистана. Ташкент, 1972 , с. 39-44.
4. Хадимов И.Р. Иксодофауна птиц Каттакурганского района Узбекс-кой СССР / Ташкент, Труд Узбекский НИВИ, 1974, с. 95-98.

# M Ü N D Ə R İ C A T

## KİMYA



## BİOLOGİYA